# İbn Qudamə əl-Maqdisi

Şeyx, imam, şeyxul-islam Muvaffəqu'd-Din Əbu Muhamməd Abdullah bin Əhməd 'bnu Muhamməd 'bnu Qudaməti'bnu Miqdami'bnu Nasr əl-Maqdisi əl-Cəmmaili, sonra əd-Diməşqi əs-Salihi əl-Hənbəli, məşhur "əl-Muğni" kitabının sahibidir.

Muvaffəqu'd-Din ibn Qudamə hicri 541-ci ildə şaban ayında Fələstinin Nablus bölgəsinin kəndlərindən olan Cəmmail adlı bir kənddə doğulmuşdur. On yaşı olarkən hicri 551-ci ildə ailəsi və qohumları ilə Dəməşqə köçürlər. Elm ilə ilk olaraq orada tanış olmuşdur, Quranı və hənbəli fiqhində "Muxtəsar əl-Xiraqi" kitabını hifz etmişdir. Şeyxləri yanında kitablar öyrənmiş və dərin fiqhə yiyələnmişdir. Gözəl xətt sahibi idi və elm dəryalarından, zəka nümunələrindən biri idi.

O, dayısı oğlu əl-Hafiz Abdulğani bnu Abdulvahhab bnu Əli əl-Maqdisi ilə ilə birlikdə elm yolunda olmuşdur. Dayısı oğlu əl-Hafiz Abdulğani daha çox hədisə, İbn Qudamə isə fiqh elminə maraq göstərmişdir. Qohumları bu iki gəncin marağını layiqincə dəyərləndirirlər və onlara bu elm yolunda çox dəstək olublar. Onların hər ikisi də hicri 561-ci ildə səfər edirlər və Bağdadda dörd ilə yaxın bir müddətdə qalırlar. İlk əvvəl hənbəli alimi, məşhur imam Abdulqadir bnu Abdilləh əl-Ceylani'nin yanında dərs alırlar, əl-Ceylani onlara çox gözəl münasibət göstərir, lakin onların gəlişindən az sonra Şeyx əl-Ceylani vəfat etmişdir, bundan sonra hər ikisi də İbnu'l-Cəvzi'nin yanında yerləşirlər. Daha sonra Nasirud-Din Əbul-Fəth və hənbəlilərin şeyxi və muftisi İbnul-Mənni əl-Hənbəlinin yanında fiqh, xilaf və üsul elmini öyrənirlər. Hibbətullah bnu əl-Həsən əd-Dəqqaq, Əbul-Fəth bnu əl-Batti, Əbu Zura bnu Tahir, Əhməd bnu əl-Muqarrab, Əli bnu Tacil-Qurra, Məamər bnu əl-Fəxir, Əhməd bnu Əhməd ər-Rahibi, Heydəra bin Ömər əl-Ələvi, Abdulvahid ibn əl-Hüseyn əl-Barizi, Xədicə ən-Nəhravaniyyə, Nəfisə əl-Bəzzazə, Şuhdə əl-Kətibə, əl-Mubarək bin Muhamməd əl-Badərai, Muhamməd bin Muhamməd ibnus-Səkən, Əbu Şucə Muhamməd bin əl-Hüseyn əl-Mədarai, Əbu Hənifə Muhamməd bin Ubeydullah əl-Xatibi və Yəhya bin Sabit kimi alimlərdən elm almışlar.

Əli Əbul-Həsən Əli bin Asəkir yanında Nafi qiraətini, müəllimi Əbul-Fəth İbn Mənni yanında isə Əbu Amr qiraətini öyrənmişdir. Müəllimi Əbul-Fəth İbn Mənni yanında fiqhi dərindən öyrənmiş, öz müasirlərini üstələmişdir.

Dəməşqə qayıtdıqdan sonra bir daha 567-ci ildə İmədud-Din Əbu İshaq İbrahim bin Abdulvahid bin Əli əl-Maqdisi ilə birlikdə Bağdada geri dönmüş və hər ikisi də orada bir il qalmışdır. 573-cü ildə həcc edir və Məkkənin alimlərinin yanında dərs dinləyir.

ən-Nasih bin əl-Hənbəli qeyd edir ki, İbn Qudamə 574-cü ildə həcc edir, sonra iraqlılar ilə birlikdə Bağdada gəlir. Orada bir il qalır və şeyxi, müəllimi Əbul-Fəth İbn Mənni'nin yanında biliklərini artırır, sonra Dəməşqə geri qayıdır və "əl-Muğni" kitabını yazmağa başlayır.

İbn Qudamə zamanında Şamın alimi idi. Dərin elmi və yəqinliyi ilə birlikdə təqvalı, zahid, heybət və hörmət sayibi idi. Davranışlarında yumşaqlıq var idi, vaxtını elm və əməl ilə keçirərdi. Rəqiblərini dəlillər ilə susdurardı, bu zaman heç bir rahatsızlıq yaşamaz və sıxılmazdı, rəqibi isə qışqırar və narahatçılıq keçirərdi.

əd-Diya əl-Maqdisi Muhamməd bin Abdilvahid deyir: "əl-Muvaffəq münazərə etdiyi hər bir kəsin üzünə gülümsəyərdi." əz-Zəhəbi bu sözlərin üzərinə qeyd yazaraq deyir ki, müşahidə etdiklərimizin çox münazərə edərkən acıqlı davranırlar."

əl-Muvaffəq cümə namazından sonra münazərə üçün uzun zaman oturardı və fəqihlər onun yanına toplanardı. Günortaya qədər dərs verərdi, zöhrdən sonra isə məğribə qədər dərs verərdi, bununla belə rahatsız olmazdı. Onun yanında kitab oxuyarlar və o, tələbələrinə nəhv oxutdurardı. Onu görən hər bir kəsin qəlbində sevgi təəssüratı qoyardı. Sahib olduğu bir kənizi ona öz əxlaqı ilə əziyyət versə də o, kənizə heç bir şey söyləməzdi.

İbnun-Nəccar deyir: "əl-Muvaffəq Dəməşq məscidində hənbəlilərin imamı idi. Etibarlı, höccət və alicənab biri idi, çoxlu fəzilət sahibi, xeyirxah, təqvalı abid bir kimsə idi və sələfin qanunu üzərində olmuşdur. Üzərində nur və hörmət var idi. İnsan sözünü dinləmədən əvvəl belə onu görməklə faydalanardı."

Əbul-Abbas İbn Teymiyyə deyir: "əl-Əvzai'dən sonra Şeyx əl-Muvaffəq'dən – rahiməhullah – daha fəqih heç kimsə Şama daxil olmamışdır."

Tələbələrindən olan əd-Diya əl-Maqdisi öz şeyxinin tərcümeyi-halını yazmışdır. Onun haqqında bunları deyir: "Çox gözəl əxlaqa sahib idi, onu az qala heç kəs təbəssümsüz görməzdi. Hekayələr danışar və zarafat edərdi. əl-Bəha'nı belə deyərkən eşitdim: "Onun yanında kitab oxuyarkən bizimlə zarafatlaşardı və bizimlə sərbəst davranardı. Bir dəfə onun yanında dərs alan uşaqlardan şikayət etdilər. Belə cavab verdi: "Onlar uşaqdır, oynamaqları təbii bir şeydir. Siz də onlar kimi olmusunuz." Dünya əhli ilə dünya uğrunda yarışa çıxmazdı, az qala heç bir zaman şikayət etməzdi, halbuki bəlkə də başqasından daha çox ehtiyac içində yaşayardı."

İbn Qudamə öz əmisi qızı Məryəm bint Əbi Bəkr bin Abdilləh bin Sad əl-Maqdisi ilə evlənmişdir. Ondan əl-Məcd İsa, Muhamməd, Yəhya, Safiyyə və Fatimə adlı beş övladı olmuşdur. Muhamməd və Yəhya o hələ yaşayarkən vəfat edir. Oğullarından yalnız İsa qalır, o isə özündən sonra iki oğul qoyur və hər ikisi də vəfat edir, bununla da İbn Qudamə'nin nəsəbi kəsilir.

Hicri 573-cü ildə Səlahuddin'in səlibçilərə qarşı yürüşünə qoşulur və Qüdsün azad edilməsində rolu olmuşdur.

Hicri 620-ci ildə ramazan bayramı şənbə günü vəfat etmişdir.[1]

[1] İbn Qudamənin tərcümeyi- halı üçün bax: "Siyər Əaləm ən-Nubələ", 22/165-173; "Şəzərat əz-Zəhəb", 5/88-92; "əl-Bidayə ban-Nihayə", 13/99-101; "Zeylu Tabəqatil-Hənəbilə li İbn Racəb", 2/133-149; "əl-Muğni" kitabına təhqiq sahibinin yazdığı müqəddimə, 1/6-37

بسم الله الرحمن الرحيم

Əş-Şeyx əl-İmam əl-Alləmə Şeyxul-İslam Muvaffəqu'd-Din Əbu Muhamməd Abdullahi'bnu Əhmədə'bni Muhammədi'bni Qudamə əl-Maqdisi – *Allah ruhunu pak etsin, qəbrini işıqlandırsın!* - dedi:

Bütün dillərdə həmd olunan, hər bir zamanda ibadət olunan, elmindən heç bir məkanın xali olmadığı, bir işin onu başqa işlərdən məşğul etmədiyi Allaha həmd olsun!

Tayı və bənzərinin ola bilməyəcəyi qədər böyükdür, eş və övladlardan pakdır və hökmü bütün qulları üzərində keçərlidir.[2]

Düşünməklə əqllərdə təmsil olunmaz, təsvir etməklə qəlblərdə təsəvvür olunmaz. "**Onun misli yoxdur və O, Eşidəndir və Görəndir!**" (əş-Şura, 11) Bütün ali sifətlər və "**Bütün gözəl adlar Ona aiddir.**" (Taha, 8) "**ər-Rahmən Ərşə yüksəldi. Göylərdə və Yerdə, onların arasında və torpağın altında nə varsa Ona aiddir. Sən sözü ucadan söyləsən də, O, sirri də, ondan da gizli olanı da bilir.** " (Taha, 5-7)

"**Allah hər şeyi elmi ilə əhatə etmişdir**." (ət-Taləq, 12) Hər bir məxluqu izzəti və hökmü ilə qəhr[3] etmiş, hər bir şeyi rəhməti və elmi ilə bürümüşdür. "**Onların keçmişini də, gələcəyini də bilir. Onların elmi isə Onu əhatə edə bilməz.**" (Taha, 110)

O, Özünü əzəmətli kitabında və şərəfli elçisinin dili ilə vəsf etdikləri ilə vəsf olunmalıdır.

---

[2] Burada hökm ilə qəsd olunan Allahın qədəridir, çünki məhz Allahın qədəri bütün qulları arasında keçərlidir. Həm müsəlman, həm də kafir qulları Onun qədərinə tabe olmaqdadır və tabe olmaları qaçınılmazdır. (bax: Şeyx Saleh əl-Favzan, "**Şərh Lumətil-İtiqad**", səh: 29)

[3] Qəhr ərəb dilində "qüvvət, üstünlük anlamındadır. Onu qəhr etdi; yəni, ona qalib gəldi, ona güc gəldi, onu istila etdi, onu hakimiyyəti altına, kontrolu altına aldı. Öz ixtiyarı altına keçirdi, onun üçün hec bir ixtiyar buraxmadı, yalnız Allahın izni ilə ixtiyar sahibidir." Bax: Şeyx İbn Cibrin, "**əl-İrşad Şərh Lumətil-İtiqad**", səh: 59

ər-Rahmən'in Quranda qeyd olunmuş və əl-Mustafa'dan – *salləllahu aleyhi va sələm* – səhih olaraq sabit olmuş sifətlərinə iman gətirmək, onları təslimiyyətlə qəbul etmək, rədd, təvil[4], təşbih[5] və təmsil[6] etməklə onlara etiraz etməyi tərk etmək vacibdir.

Bunlardan problemli olanlara gəldikdə isə, onları ləfzdə deyərək isbat etmək, mənasına toxunmağı tərk etmək vacibdir. [7] Onun elmini onu Deyənə həvalə edirik və məsuliyyətini onu nəql edənə tərk edirik və bu işimizdə elmdə qüvvətli olanların yoluna tabe oluruq, o kəslər ki, Allah – *Subhənəhu va Təalə* - onlar haqqında mənası aşkar olan kitabında deyir: "**Elmdə qüvvətli olanlar isə - "Biz onlara iman gətirdik, onların hamısı Rəbbimizin dərgahındandır." – deyərlər.**" (Ali-İmran, 7)

Qurandakı mütəşabihləri təvil etmək məqsədini güdənləri isə tənqid edərək onlar haqqında deyir: "**Lakin ürəklərində əyrilik olanlar isə fitnə-fəsad salmaq və təvil etmək məqsədi ilə mütəşabih ayələrə uyarlar...**" (Ali-İmran, 7)

Onların təvil etmək məqsədlərini ürəklərindəki əyriliyin bir əlaməti saymışdır və onların pisliklərinə işarə edərkən bunu onların fitnə çıxarmaqları ilə birlikdə qeyd etmişdir.

Sonra – *Subhənəhu* – "**Halbuki onun təvilini Allahdan başqa heç kəs bilmir**" – deyərək onlarla arzu etdikləri arasına sədd çəkmiş və istəklərini məqsədlərindən ayırmışdır.

---

[4] Təvil həm təfsir etmək, həm də izah etmək anlamında istifadə oluna bilər. Burada Allahın ad və sifətlərini təfsir etmək, yəni onları həqiqi mənalarını qəbul etməyərək, başqa mənalarda təfsir etmək qəsd olunur.

[5] Təşbih, bənzətmək anlamındadır. Yəni Allahı məxluqata bənzətmək qəsd olunur. Belə bir etiqad küfrdür.

[6] Təmsil, misal vermək anlamındadır. Yəni, Allahın ad və sifətlərinə məxluqatdan misal verməklə təmsil edilmiş olur. Təşbih və təmsil bu yöndə yaxın mənalı terminlərdir.

[7] "**Lumətu'l-İtiqad**" kitabının nüsxələrindəki sözlər bir-birilərindən fərqlənir. Daru'l-Əsəriyyə nəşriyyat evi bunu Əli'bnu Həsən əl-Hələbi'nin təhqiqi ilə çap etmişdir. Orada (səh: 39) həmin bu cümlə bu şəkildə təqdim olunur: "**Bunu ləfzdə deyərək isbat edirik, mənasına etiraz etməkdən uzaqlaşırıq.**"

## Sələf imamlarının Allahın sifətləri haqqındakı sözləri

Əl-İmam Əbu Abdillah Əhmədu'bnu Muhammədi'bni Hənbəl peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – "Şübhəsiz ki, Allah dünya səmasına enir"[8] və "Şübhəsiz ki, Allah Qiyamət günü görüləcəkdir"[9] sözləri və buna bənzər hədislər haqqında deyir: "biz bunlara iman gətiririk və bunları təsdiqləyirik; keyfiyyətsiz, mənasız[10]. Bunlardan heç bir şeyi rədd etmirik. Bilirik ki, Allah Elçisinin gətirdiyi hər bir şey[11] haqqdır və Allah Elçisinə - *salləllahu aleyhi va səlləm* - qarşı gəlmirik. Allahı Özünü vəsf etdiyindən artıq bir şeylə vəsf etmirik; nə az, nə də çox: "**Onun bənzəri yoxdur və O, Eşidəndir və Görəndir!**" (əş-Şura, 11) Onun dediyi kimi deyirik, Özünü Özünün vəsf etdiyi kimi vəsf edirik və bu həddi aşmırıq.

Onu vəsf edənlər vəsf etməkdə acizdirlər.

Quranın hamısına, həm möhkəm ayələrinə, həm də mütəşabih ayələrinə iman gətiririk.

Qınayanların qınaması üzündən Onun sifətlərindən heç bir sifətdən əl çəkmirik.[12]

Quranın və hədisin qoyduğu həddi aşmırıq, bunların mahiyyətinin necəliyini yalnız peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – təsdiqi və Quranın sübutu ilə bilirik.[13]

---

[8] İmam Əhməd "**əl-Müsnəd**" əsərində (16/211; rəq: 10313) rəvayət etmişdir. Şeyx əl-Arnavut "əl-Müsnəd" əsərinin təhqiqində deyir: "**Hədisin sənədi əl-Buxari və Muslim'in şərtlərinə görə səhihdir.**" Bunu həm də İmam Malik "əl-Muvatta" əsərində (2/299; rəq: 725), ət-Tirmizi "əl-Cami"də (5/526; rəq: 3498) və Əbu Davud "əs-Sünən"də (4/376; rəq: 4735) rəvayət etmişdir.

[9] Qiyamət günü Allahın görülməsi haqqında gəlmiş hədislər üçün bax: İbnul-Əsir, "**Cəmi'u'l-Usul**"(10/438, rəq: 7973; 10/446, rəq: 7975; 10/557-560, rəq: 8125-8128) və bax: "**Şərh Əqidəti't-Tahaviyyə**" (1/215-218) Allahın görünməsi haqqındakı hədislərin mütəvatir olması.

[10] Burada "mənasız" sözü ilə, bu sifətlərin heç bir mənalarının olmadığı qəsd edilmir, lakin bidət əhlinin sifətlərə verdikləri mənalar inkar olunur, yəni sifətləri bu mənalara yozmadan iman gətirmək lazımdır.

[11] Daru'l-Əsəriyyə nəşrində bu cümlədə "**əgər səhih sənədlərlə rəvayət olunubsa**" şəklində bir əlavə vardır. (bax: səh: 42)

[12] Sifətləri isbat etdiyimiz üçün və onları olduğu kimi qəbul etdiyimiz üçün bidət əhli bizə müxtəlif adlar veriblər. Bizlərə müşəbbihə, mücəssimə, həşəviyyə və digər nalayiq adlar veriblər. Müəllif də - rahiməhullah – buna işarə edərək qeyd edir ki, bu şəkildə qınamaya görə haqqda güzəşt etmək olmaz.

[13] Allahın sifətləri təvqifi bir məsələdir, yəni insan bu növ məsələləri yalnız vəhy yolu ilə bilir. Ona görə də burada həddi aşmaq və öz ağlımızı istifadə edərək onların keyfiyyəti üzərində fikirləşmək olmaz.

əl-İmam Əbu Abdilləh Muhammədi'bni İdris əş-Şafi – *radiyallahu anhu* – deyir: "Allaha və Allah haqqında Ondan gələn xəbərlərə Onun qəsd etdiyi mənada iman gətirdim. Allahın Elçisinə və onun haqqında ondan gələn xəbərlərə Allahın Elçisinin qəsd etdiyi mənada iman gətirdim."

Sələf və onlardan sonra gələn imamlar – *Allah onlardan razı olsun!* - bu etiqad üzərində hərəkət ediblər. Onların hamısı ittifaq edirlər ki, Allahın Kitabında və peyğəmbərinin sünnətində sifətlər haqqında gəlmiş hər bir şey haqqında, onları təvil etmədən iqrar, imrar [14] və isbat etmək lazımdır. Onların əsərlərini izləməklə, mayaklarını özümüzə bələdçi götürməklə əmr olunduq.

Sonradan uydurulmuş şeylərdən uzaq durmaqla əmr olunduq və onların zəlalət olması haqqında xəbərdar edildik.

Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – demişdir: "Məndən sonra Sünnətimə və hidayət üzərində olan adil xəlifələrin sünnətinə tabe olun, onlara azı dişlərinizlə tutunun. Sonradan uydurulmuş işlərdən uzaq durun, beləki sonradan uydurulmuş hər bir şey bidətdir və bütün bidətlər zəlalətdir."[15]

Abdullahi'bnu Məsud – radiyallahu anhu – demişdir: "Tabe olun, bidət etməyin! Bu, kifayət edir."[16]

---

[14] "İqrar" təsdiq etmək anlamındadır. "İmrar" isə gələn xəbərləri olduğu kimi ötürməkdir.

[15] **Hədis səhihdir**. Əhməd "əl-Müsnəd"də (4/126-127) rəvayət edir; əl-Arnavut deyir: "**Hədis səhihdir.**" Eynilə Əbu Davud "əs-Sünən"də (4607), İbn Macə "əs-Sünən"də (42,43) və ət-Tirmizi (2676) rəvayət ediblər. Yenə əd-Darimi (1/44) və İbn Hibban "əs-Səhih"də (102; məvarid) rəvayət etmişdir, Şeyx əl-Arnavut İbn Hibbanın kitabının təhqiqində isnadının səhih olduğunu deyir. Yenə əl-Hakim "əl-Müstədrək"də (1/97) və İbn Əbi Asim "əs-Sünnə"də (səh: 17; rəq: 20, 29,30), əl-Beyhəqi "Dəlailun-Nubuvvə"də (6/541) və əl-Hafiz İbn Abdilbərr "Cami Bəyanil-İlm va Fadlihi" əsərində (1/222; rəq: 224) əl-İrbad bin Səriyyə Əbu Nuceyh'in hədisindən – radiyallahu anhu - rəvayət ediblər. ət-Tirmizi hədis haqqında deyir: "**Həsən səhih**". Yenə əl-Hakim hədisi səhih sayır və əl-Hafiz əz-Zəhəbi "ət-Təlxis"də deyir: "**Səhihdir, heç bir illəti yoxdur.**" İbn Abdilbərr isə kitabında Əbu Bəkr Əhməd bin Amr əl-Bəzzar'dan belə dediyini nəql edir: "**İrbad'ın rəşidi-xəlifələr haqqında rəvayət etdiyi hədis səhihdir, sabitdir.**" Bu sözündən sonra İbn Abdilbərr deyir: "**Bu, onun dediyi kimidir**." Bu hədisi Şeyxul-İslam İbn Teymiyyə "Məcmu əl-Fətava"da (20/309) və "İqtidaus-Siratil-Mustəqim"də (2/579) səhih saymışdır. Şeyx əl-Albani "Sahih əl-Cami əs-Sağir"də (2/346) və İbn Əbi Asim'in "əs-Sünnə" əsərinin təxricində (səh: 17; rəq: 20 və səh: 29; rəq: 30) səhih saymışdır.

[16] **Rəvayət səhihdir**. Bunu tabiin nəslindən üç nəfər rəvayət etmişdir. ət-Tabərani "əl-Kəbir"də (rəq: 8870), əl-Beyhaqi "əl-Mədxal"də (204), əd-Darimi (211) və İbn Vaddah "əl-Bidu van-Nəhyu anhu" əsərində (səh: 10) rəvayət etmiş və əl-Heysəmi "Məcmə əz-Zəvaid" əsərində (1/181) bunu zikr etdikdən sonra demişdir: "**Raviləri "əs-Səhih"in raviləridir.**"

Öməru'bnu Abdilaziz – *radiyallahu anhu* – belə bir mənada bir söz söyləmişdir: "İnsanların durduğu yerdə dur! Beləki onlar bildikləri elmə əsasən durublar, güclü bəsirətlərinə əsasən dayanıb çəkiniblər, onların kəşf etmək qabiliyyətləri daha güclü idi[17] və bunda bir fəzilət olsaydı ona daha layiq onlar olardılar. Əgər - "bir çox məsələ onlardan sonra ortaya çıxmışdır"- desəniz, (deyərik ki,) onların hidayətinə müxalif olan, sünnətlərini bəyənməyən kəslər bu məsələləri ortaya çıxarmışlar. Onlar şəfa edəcək qədərini vəsf ediblər, kifayət edəcək qədəri barəsində söz açıblar. Bundan çox danışan həddini aşandır, bundan az danışan isə haqqını tam verməmişdir. Bir qrup insanlar haqqını tam ödəməmiş və cəfaya düçar olmuşlar. Digərləri isə həddlərini aşıblar və ifrata varıblar. Onlar isə bu ikisi arasındadırlar, dos-doğru hidayət üzərindədirlər."[18]

əl-İmam Əbu Amr əl-Əvzai – *radiyallahu anhu* – dedi: "İnsanlar səni inkar etsələr belə sələfin əsərlərinə tabe ol! İnsanlar dilləri ilə öz sözlərinə bəzək vursalar belə, insanların fikirlərindən uzaq dur!"[19]

Muhamədu'bnu Abdirrahmən əl-Ədrami, bidət söyləyən və insanları öz bidətinə dəvət edən bir nəfərə dedi: "Allahın Elçisi, Əbu Bəkr, Ömər, Osman və Əli bunu bilirdi, yoxsa bilmirdilər?" Həmin adam cavab verdi: "Onlar bilmirdilər." O zaman soruşdu: "Onların bilmədiyi bir şeyi sənmi bildin?" Adam dedi: "Onda mən deyirəm ki, onlar bunu bilirdilər." Dedi: "Bu barədə danışmamaqları, insanları buna dəvət etməməkləri onlar barəsində mümkündür, yoxsa mümkün deyildir?" Dedi: "Bəli, mümkündür." Buna cavab olaraq dedi: "Allahın Elçisi – *salləllahu aleyhi va səlləm* – və xəlifələri barəsində mümkün olan şey, sənin üçün mümkün deyildirmi?!" Adam susdu. Onların hüzurunda olan xəlifə dedi: "Onların barəsində mümkün olan bir şeyi özünə mümkün saymayana Allah rəhm etməsin!"

---

[17] Yəni, şəri elmləri kəşf etmək qabiliyyətində əvvəlki insanlar daha güclü olublar, çünki peyğəmbərə - salləllahu aleyhi va səlləm – daha yaxın olublar. Lakin onlar cahilliklərinə görə deyil, elmli olduqlarına görə bu məsələləri araşdırmaqdan çəkiniblər.

[18] Bu əsəri İbn Qudamə "əl-Burhan fi Bəyani'l-Quran" kitabında (səh: 88-89) Abdulazizi'bnu Ubey əl-Məcişun'un sözü olaraq gətirir və sonra deyir: "**Belə bir mənada olan söz Öməru'bnu Abdulaziz'dən rəvayət olunmuşdur.**" Eləcədə əl-Hafiz İbnul-Cəvzi bunu Öməru'bnu Abdulaziz'in fəzilətləri haqqında yazdığı kitabında (səh: 83-84) rəvayət etmişdir.

[19] Rəvayət səhihdir. əl-Xatib bunu "Şərəf Əshabul-Hədis"də (səh: 7) və əl-Əcurri "əş-Şəriə"də (səh: 58) və ondan isə İbn Abdilbərr "Cami'u Bəyani'l-İlm va Fadlihi"əsərində (2/114) əl-Abbas bin əl-Valid bin Məzid əl-Beyruti'dən rəvayət ediblər; dedi: "**Atamı belə deyərkən eşitdim: "əl-Əvzai'ni belə deyərkən eşitdim**" və sonra qalanını zikr etmişdir. Bu isnad səhihdir. əl-Hafiz İbn Hacər'in "ət-Təqrib"də (1/399) əl-Abbas bin əl-Valid haqqında onun "saduq" olmasını söyləməsinə gəldikdə isə, bu, tənqidə layiq bir sözdür. Beləki onu İbn Əbi Hatim, ən-Nəsai, İbn Hibban və başqaları siqa sayıblar. Bax: "ət-Təhzib", (5/115-116), "əl-Cərh vat-Tədil" (2/216), "Tabəqatul-Hənəbilə" (1/235) Bu əsəri əz-Zəhəbi "Siyər Ə'aləmi'n-Nubələ" kitabında (7/120) və "əl-Uluv lil-Aliyyil-Ğaffar" əsərində gətirmişdir. "Muxtəsarul-Uluv"da (səh: 138) Şeyx əl-Albani sənədini səhih saymışdır.

Eynilə sifət ayələrini tilavət etmək, bu barədə gələn xəbərləri oxumaq və (bu xəbərləri) gəldiyi şəkildə ötürmək kimi Allahın Elçisinin – *salləllahu aleyhi va səlləm* – , səhabələrin, xeyirdə onlara tabe olanların, onlardan sonra gələn imamların və dərin elmə sahib olan kəslərin etmələri mümkün olan şeyləri mümkün görməyənlərə Allah rəhm etməsin!

## Bəzi sifətlərin zikri

Bizə gəlmiş sifət ayələrinə aid olanlar arasında Allahu Təalə'nin bu sözləri də vardır: "**Rəbbinin Üzü qalıcıdır**" (ər-Rahmən, 27) və deyir: "**Əksinə Onun hər iki Əli açıqdır**." (əl-Maidə 64)

Allahu Təalə İsa'nın dediyi sözü bizə xəbər verərək deyir: "**Sən mənim nəfsimdə olanları bilirsən, mən isə Sənin nəfsindəkiləri bilmirəm.**" (əl-Maidə, 116) Allahu Təalə yenə buyurur: "**Sənin Rəbbin və səf-səf** (düzülmüş halda) **mələklər gələcək**" (əl-Fəcr 22) və yenə deyir: "**Yoxsa onlar ancaq onu gözləyirlər ki, Allah bulud kölgəsində mələklərlə birlikdə gəlsin...**" (əl-Bəqərə, 210)

Allahu Təalə deyir: "**Allah onlardan razıdır, onlar da Ondan razıdırlar**" (əl-Beyyinə, 8) və yenə Allahu Təalə deyir: "**onları sevir, onlar da Onu sevirlər**". (əl-Maidə, 54) Allah Təalə kafirlər haqqında buyurur: "**Allahın onlara qəzəbi tutmuşdur**"( əl-Fəth, 6) və deyir: "**onlar Allahın qəzəbinə səbəb olan şeyə uydular**" (Muhamməd, 28) Allahu Təalə deyir: "**Allah onların döyüşə getmələrini xoş görmədi.**" (ət-Tövbə, 46)

Sünnədə gələnlərə isə misal olaraq peyğəmbər – *salləllahu aleyhi va səlləm* – demişdir: "Rəbbimiz hər gecə dünya səmasına enir."[20] Eləcədə deyir: "Cavanlıq etməyən gənc Rəbbinin xoşuna gəlir."[21] Yenə demişdir: "Allah, biri digərini öldürmüş, sonra da hər ikisi

---

[20] əl-Buxari "**əs-Səhih**"də (1/384; rəq: 1094), Muslim "**əs-Səhih**"də (2/175; rəq: 1808) rəvayət edib.

[21] Əhməd "**əl-Müsnəd**"də (4/151), İbn Əbi Asim "əs-Sünnə"də (571), Əbu Yalə (1479), ət-Tabərani "əl-Kəbir"də (17/309), əl-Qadai "Musnəduş-Şihab"da (576), Təmam ər-Razi "əl-Fəvaid"də (1287) və əl-Beyhaqi "əl-Əsma vas-Sıfat"da (səh: 600) rəvayət ediblər. əl-Hafiz əs-Səxavi "əl-Məqasidul-Həsənə"də (səh: 123) deyir: "**Bunu Əhməd və Əbu Yalə rəvayət edib və sənədi həsəndir. Şeyximiz bunu "fətvalar"ında İbn Ləhia'ya görə zəif saymışdır.**" Şeyximiz deyərkən bununla əl-Hafiz İbn Hacəri qəsd edir. əl-Munəvi "Feydul-Qadir"də (2/334; rəq: 1799) deyir: "**əl-Heysəmi dedi: "İsnadı həsəndir" və İbn Hacər "fətvalar"ında İbn Lahia'nın zəifliyinə görə hədisi zəif saymışdır.**" Eləcədə Şeyx əl-Albani "əs-Silsilə əd-Daifə"də (2426) zəif saymışdır, lakin daha əvvəl hədisə "əs-Silsilə əs-Sahihə" kitabında (2843) səhih hökmü vermişdi. Eləcədə Şeyx İbn Useymin "Lumətul-İtiqad" kitabının şərhində (səh: 59) Abdullah bin Lahia'ya işarə edərək hədisin zəifliyini göstərmişdir. Lakin Şeyx Şueyb əl-Arnavut "əl-Müsnəd"də bu hədisin təxricində deyir: "**Həsən li-ğeyrihi; Abdullah bin Lahia hafizəsi zəif biridir, lakin burada ondan rəvayət edənin adı Quteybə bin Said'dir. Elm əhlindən bəziləri onun İbn Lahia'dan rəvayətlərini qəbul ediblər, çünki o, hədisləri İbn Vəhb'in kitabından yazmış, sonra isə İbn Lahia'dan eşitmişdir. İbn Vəhb isə (İbn Lahia)dan hafizəsi korlanmadan və kitabları yanmadan əvvəl hədis eşitmişdir. Bu**

də Cənnətə daxil olmuş iki nəfərə gülür."[22] Bu və buna bənzər sənədi səhih, raviləri adil sayılmış hədislərə iman gətiririk, rədd etmirik və inkar etmirik. Zahiri mənasına müxalif olacaq şəkildə heç bir təvil ilə təvil etmirik. Onu nə məxluqların sifətlərinə, nə də sonradan yaranmışların xüsusiyyətlərinə bənzətmirik. Bilirik ki, Allahın – *Subhənəhu va Təalə* - heç bir bənzəri və tayı yoxdur. "**Onun misli yoxdur və O, Eşidəndir və Görəndir!**" (əş-Şura, 11) Zehinlərdə xəyal edilən və ağıllara gələn hər nə varsa, şübhəsiz ki, Allahu Təalə onun əksidir.

Bunlardan da biri Allahu Təalənin bu sözündədir: "**ər-Rahmən Ərşə ucaldı**." ( Taha, 5) Eləcədə deyir: "**Göydə olandan sizi yerə batırmayacağına əminsinizmi**?" (əl-Mülk, 16) Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – buyurmuşdur: "Səmada olan Rəbbimiz! Adın müqəddəs olsun!"[23] Kölə qadına isə belə demişdi: "Allah haradadır?" Dedi: "Səmadadır." O zaman buyurdu: "Onu azad et! Çünki o, mömindir."[24] Bunu imamlardan Malik bin Ənəs, Muslim və o ikisindən başqaları rəvayət ediblər.

Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – Huseynə demişdi: "Neçə ilaha ibadət edirsən?" Dedi: "Yeddi dənə; altı dənəsi yerdədir, bir dənəsi isə göydədir." O zaman soruşdu: "Onlardan hansını sevir və hansından qorxursan?" Dedi: "Göydə olandan!" Bunun üzərinə buyurdu: "O zaman o altı dənəni tərk et və göydə olana ibadət et! Mən isə sənə iki dua öyrədəcəm." O, bununla İslamı qəbul etdi və peyğəmbər – *salləllahu aleyhi va*

---

**hədisi əl-Heysəmi "əl-Məcmə"də (1/270) həsən saymışdır və bunun Əbu Hureyrə'nin hədisindən şahidi vardır.**" Hədisin hökmünün həsən və ya zəif olmasından asılı olmayaraq, hədisdə qeyd olunan "acəb" (xoşlanmaq) sifəti Quranda və digər səhih hədislərdə gəlmişdir.

[22] əl-Buxari (3/1040; rəq: 2671) və Muslim (6/40; rəq: 5000) rəvayət ediblər.

[23] **Zəifdir.** Bunun iki sənədi vardır: Birinci: Ziyadə bin Muhammməd bunu Muhammməd bin Kab əl-Qarazi'dən, o da Fədalə bin Ubeyd'dən, o isə Əbud-Darda'dan rəvayət edir. Bunu Əbu Davud "əs-Sünən"də (3892), ən-Nəsai "Aməlul-Yəumi val-Leylə"də (1037), əl-Hakim (1/344), əl-Beyhaqi "əl-Əsma vas-Sıfat"da (səh: 423), əd-Darimi "ər-Raddu aləl-Cəhmiyyə"də (70) və İbn Qudamə "əl-Uluv"da (18) rəvayət ediblər. Sənədi çox zəifdir, Ziyadə bin Muhammməd əl-Ənsari "ət-Təqrib"də deyildiyi kimi tərk olunmuş bir ravidir. əl-Buxari və ən-Nəsai'nin dediyi kimi onun hədisləri münkərdir. (bax: "Mizənul-İtidəl", 2/98; rəq: 1988) əz-Zəhəbi qeyd edir ki, o, bu hədisi tək başına rəvayət etmişdir. əl-Hakim'in bu hədisi səhih saymasına etiraz edərək demişdir: "**Ziyadə haqqında əl-Buxari və başqaları deyirlər: hədisləri münkərdir.**" "əl-Uluv"da isə deyir: "**Ziyadə leyyinul-hədis'dir**." (bax: Şeyx əl-Albani, "Daif ət-Tərğib vat-Tərhib", 2013 ) İkinci sənəd: Bunu Əhməd (6/20-21) Əbu Bəkr bin Əbi Məryəm vasitəsilə şeyxlərdən, onlar da Fədalə bin Ubeyd əl-Ənsari'dən rəvayət edir. Sənədi zəifdir, çünki orada məchul olar ravilər vardır və üstəlik Əbu Bəkr bin Əbi Məryəm zəifdir.

[24] Muslim "əs-Sahih"də (33, 537) Muaviyə bin əl-Həkəm'in hədisindən rəvayət etmişdir.

*səlləm* – ona belə deməyi öyrətdi: “Allahım! Mənə rüşdü[25] ilham et və nəfsimin şərrindən məni qoru!”[26]

Qədim kitablarda peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – və səhabələrinin əlamətləri arasında qeyd olunan əlamətlərdən də biri bu idi ki, “onlar Yerdə səcdə edərlər və ilahlarının Səmada olduğunu iddia edərlər.”[27]

Əbu Davud “əs-Sünən” əsərində rəvayət etmişdir ki, peyğəmbər – *salləllahu aleyhi va səlləm* – belə buyurmuşdur: “Bir səma ilə digər səma arasındakı məsafə fulan qədərdir...” və xəbəri onun bu sözlərinə qədər zikr etmişdir: “Bunun üzərində isə Ərş vardır və Allah Subhənəhu Ərşin üzərindədir.”[28] Bu və bənzəri hədisləri nəql etmək və qəbul etməkdə icma etmiş sələf[29] – *Allah onların hamısına rəhmət etsin!* – bunları nə rədd etməyə, nə də onları təvil etməyə, nə məxluqa bənzətməyə, nə də məxluqu Allahla müqayisə etməyə qalxmamışlar.

---

[25] “Rüşd” sözünün mənası hər bir şeydə doğruya və haqqa tabe olmaqdır.

[26] Bunu İbn Qudamə “əl-Uluv” kitabında (19) və onun yolu ilə əz-Zəhəbi “əl-Uluv lil-Aliyyil-Ğaffar” kitabında (23-24) Racə bin Muhamməd əl-Basri vasitəsilə rəvayət edir: bizə İmran bin Xalid bin Taliq rəvayət etdi: atam mənə öz atasından, o da babasından rəvayət etdi... bu şəkildə hədisi uzun-uzun rəvayət etmişdir. əz-Zəhəbi dedi: “**İmran – yəni İbn Xalid - zəifdir.**” İsnadında Xalid bin Taliq vardır. əd-Dəraqutni onun haqqında deyir: “Güclü deyil.” Bax: “Lisənul-Mizən”, (2/379) Şeyx İbn Cibrin “**Lumətul-İtiqad**” kitabını şərh edərkən hədisin səhih olduğunu deyir, lakin onun səsli dərslərindən hazırlanmış kitabında isə bu sözlər yoxdur. Görünür ki, kitab hazırlanarkən bu sözləri oradan özü çıxarmışdır, bu isə hədisin zəif olmasından irəli gəlir.

[27] Bunu, İbn Qudamə “əl-Uluv” kitabında (səh: 21) isnadı ilə Adi bin Umeyrə bin Fərva əl-Məbədi’dən rəvayət etdiyi hekayənin içində zikr etmişdir. Bu hekayə İbn Hacər’in “əl-İsabə” kitabında (2/470) Adi bin Umeyra’nın tərcümeyi-halında keçməkdədir. əl-Hafiz əz-Zəhəbi “əl-Uluv” kitabında (səh: 25) bu xəbər haqqında deyir: “**Bu hədis ğaribdir.**” Şeyx İbn Useymin “Lumətul-İtiqad” kitabının şərhində (səh: 68) deyir: “**Bu nəql səhih deyildir, çünki heç bir sənədi yoxdur.**”

[28] **Hədis zəifdir**. Bunu Əbu Davud “əs-Sünnə”də (4708), ət-Tirmizi əl-Haqqa surəsinin təfsirində (3540) və İbn Macə müqəddimədə (181) rəvayət edirlər. ət-Tirmizi deyir: “Hədis həsən ğaribdir.” Eynilə İmam Əhməd “əl-Müsnəd”də (1/206) və əl-Laləkay “Şərhus-Sünnə”də (rəq: 650, 659) rəvayət ediblər. Şeyx İbn Cibrin şərhdə (səh: 162) deyir: “**Dedilər ki, bu hədisin sənədində Abdullah bin Amira vardır və bu hədis yalnız onunla tanınır. Lakin Şeyxul-İslam deyir: Bu hədisi dəstəkləyərək çox sayda imam bunu rəvayət etmişdir. Bunu rəvayət edənlərin arasında imamların imamı İbn Xuzeymə də bunu çap olunmuş, məşhur olan, təhqiq olunmuş “ət-Tövhid” kitabında rəvayət etmişdir; kitabının əvvəlində qeyd edir ki, o, yalnız səhih olan hədisləri, sənində heç bir tənqid olunmuş ravi və ya qopuqluq olmayan hədisləri rəvayət etmişdir. O, bu hədisi də rəvayət edir və onun barəsində susur, bu isə hədisin sabit olmasına dəlildir.**” Amma “əl-Müsnəd” kitabını təhqiq etmiş Şeyx Şueyb əl-Arnavut hədisin çox zəif olduğunu deyir və bunun üçün bir çox səbəb göstərərək hədisin zəifliyində heç bir şübhə buraxmamışdır.

[29] Yəni, bu cür hədislərin mənaları üzərində icma ediblər. Hətta bir çox halda hədislər sənəd baxımdan zəif olsa da, bu hədislərin mənasını dəstəkləyən dəlillərin çoxluğu səbəbi ilə mətnlərini qəbul ediblər və kitablarında bu növ hədisləri şahid qismində gətirirlər.

İmam Malik bin Ənəsə - *rahiməhullah* – sual verdilər və ona belə deyildi: “Ey Əbu Abdilləh! “ər-Rahmən Ərşə ucaldı.” Necə ucaldı?” Dedi: “Ucalmağın nə olduğu bilinir. Necəliyi isə ağılla dərk edilməz. Buna iman gətirmək isə vacibdir. Bu barədə soruşmaq isə bidətdir.” Sonra həmin adamın oradan çıxarılmasını əmr etdi.”[30]

---

[30] **Rəvayət səhihdir.** İbn Qudamə “əl-Uluv”da (104), əz-Zəhəbi “əl-Uluv”da (səh: 141-142), Əbu Nueym “əl-Hilyə”də (6/325 – 326), Usman bin Said əd-Darimi “ər-Raddu aləl-Cəhmiyyə”də (səh: 55), əl-Laləkay “Şərh Usuli İtiqadi Əhlis-Sunnə”də (664), Əbu Usman əs-Sabuni “Aqidətus-Sələf”də (24-26) və əl-Beyhaqi “əl-Əsma vas-Sıfat”da (səh: 408) bir-birini gücləndirən bir çox yolla rəvayət ediblər. əz-Zəhəbi “əl-Uluv”da bunu səhih saymış, eynilə əl-Albani “əl-Uluv” kitabını ixtisar edərkən hədisin güclü olduğunu demişdir. əl-Hafiz İbn Hacər “əl-Fəth”də (13/406-407) deyir: “əl-**Beyhaqi ceyyid bir sənəd ilə Abdullah bin Vəhb’dən bu şəkildə rəvayət etmişdir…**” Şeyxul-İslam İbn Teymiyyə “Məcmu əl-Fətava”da (5/365) Malikin sözünü qeyd etdikdən sonra deyir: “**Bunun kimi bir cavab Malikin şeyxi Rabia’dan da sabit olmuşdur.**”

## Allahın danışma sifətinin isbatı

Allahın sifətlərindən biri də Onun qədim olan kəlam ilə danışması sifətidir; Onu yaratdıqlarından dilədiyi kəsə eşitdirər, Onu Musa – *aleyhissələm* –heç bir vasitə olmadan eşitmişdir və Onu Cibril – *aleyhissələm* – və (eşitmələrinə) izn verdiyi mələklər və peyğəmbərlər eşidiblər. Həmdə Allah - *Subhənəhu* - axirətdə möminlərlə danışacaq və möminlər də Onunla danışacaqlar və onlara Onu ziyarət etmələrinə izn verəcək. Allahu Təalə deyir: "**Allah Musa ilə sözlə danışdı.**" (ən-Nisə, 164) Allahu - *Subhənəhu* - deyir: "**Ey Musa! Mən risaləm ilə və** (səninlə) **danışmağımla səni seçib insanlardan üstün etdim.**" (əl-Araf, 144) Allah - *Subhənəhu* - deyir: "**Onlardan bəzisi ilə Allah danışmış...**" (əl-Bəqərə, 253) Allah - *Subhənəhu* - deyir: "**Allah insanlar yalnız vəhylə və ya pərdə arxasından danışar.**" (əş-Şura, 51)

Allahın Kəlamı hərf və eşidilən səslədir. Allahu Təalə deyir: "**Oda yaxınlaşdıqda bir səda gəldi: "Ey Musa! Həqiqətən Mən sənin Rəbbinəm. Başmaqlarını çıxart, çünki sən müqəddəs Tuva vasidindəsən.**" (Taha, 11-12) Allahu Təalə deyir: "**Həqiqətən Mən Allaham. Məndən başqa heç bir ilah yoxdur. Mənə ibadət et!**" (Taha, 14) Allahdan başqa kiminsə bu sözləri söyləməsi caiz deyildir.

Abdullahi'bnu Məsud – *radiyallahu anhu* - demişdir: "Allah vəhy ilə danışdıqda səma əhli Onun səsini eşidir."[31] Bu, peyğəmbərdən – *salləllahu aleyhi va səlləm* – rəvayət olunmuşdur.

---

[31] əl-Buxari bunu "əs-Səhih"də (13/453 "fəthul-bari") İbn Məsud'dan məvquf olaraq mualləq şəkildə rəvayət etmişdir. İbn Xuzeymə "ət-Tövhid" kitabında (səh: 146-147), İbn Cərir ət-Təbəri təfsirində (22/90), Abdullah bin Əhməd "əs-Sünnə"də (537), əl-Beyhaqi "əl-Əsma vas-Sıfat"da (səh: 201) tam sənəd ilə rəvayət ediblər. Sənədi səhihdir, lakin bunun ləfzi bir qədər fərqlidir: "**Həqiqətən Allah vəhy ilə danışdıqda səmalarda yaşayanlar göydən qaya üzərində sürülən zəncirin cingiltisi kimi zəng səsi eşidirlər və səsdən quruyub qalırlar.**" Abdullah bin Əhməd'in "əs-Sünnə" əsərində (536) ləfzi belədir: "**Allah – Azzə va Cəllə - vəhy ilə danışdıqda səma əhli Onun səsini eşidir.**" İbn Qudamə "əl-Burhan fi Bəyənil-Quran"da (84-85) bunu Abdullah bin Əhmədə, "ər-Raddu aləl-Cəhmiyyə" kitabına istinad etmişdir; dedi: " **Atacan! Cəhmilər iddia edirlər ki, Allah səs ilə danışmır." Dedi: "Yalan danışırlar, onlar tətil ətrafında dövr edib dururlar.**" Bundan sonra hədisi zikr etmişdir. Şeyxul-İslam isə "Darut-Təarudil-Aqli van-Naql" kitabında (2/38) bunu Xalləl'in Yaqub bin Bəxtan'dan, onun da Əhməd'dən rəvayətinə aid etmişdir. Bu hədisin mərfu şəklini isə Əbu Davud (4738), İbn Xuzeymə "ət-Tövhid"də (95-96), əl-Beyhaqi "əl-Əsma vas-Sıfat"da (səh: 200) Əbu Muaviyə yolu ilə əl-Aməş'dən, o da Muslim bin Subeyh'dən, o isə Məsruq'dan, o da

Abdullahi’bnu Uneys peyğəmbərdən – *salləllahu aleyhi va səlləm* – belə dediyini rəvayət edir: “Qiyamət günü Allah insanları ayaqyalın, çılpaq, sünətsiz və qaralmış halda həşr edəcək. Onlara elə bir səslə nida edəcək ki, uzaqda olan da, yaxında olan da eşidəcəkdir: “Mən Məlik’əm, Mən Dəyyan’am.”[32] Bunu imamlar rəvayət ediblər və əl-Buxari bunu şahid qismində rəvayət etmişdir.

Əsərlərdən bəzilərində gəlmişdir ki, Musa – aleyhissələm – bir gecə atəş gördü; atəş onu qorxutdu və o, qorxub qaçdı. Rəbbi onu çağırdı: “Ey Musa!” Səsi tanıyaraq tez cavab verərək dedi: “Hüzurunda, qulluğunda hazıram! Qulluğunda hazıram! Səsini eşidirəm, lakin yerini görmürəm. Haradasan?” Dedi: “Mən sənin üzərindəyəm, qarşındayam, sağındayam, solundayam – bil ki, bu sifət Allahu Təalədən başqa heç kəsə layiq deyildir - . Dedi: “Dediyin kimisən, ey Rəbbim! Sənin səsini yoxsa göndərdiyin elçinin səsini eşidirəm?” Dedi: “Xeyr, Mənim səsimdir, ey Musa!”[33]

---

Abdullah’dan rəvayət edir: “**Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: “Allah vəhy ilə danışdıqda səma əhli zəncirin zəngi kimi bir cingilti eşidirlər.**” . Şeyx əl-Albani “əs-Silsilə əs-Sahihə”də (1293) deyir: “İsnadı əl-Buxari və Muslim’in şərtlərinə görə səhihdir.” Sonra isə deyir: “**Məvquf burada mərfu rəvayətdən daha səhih olsa belə - buna görə də əl-Buxari bunu mualləq olaraq “əs-Sahih”də qeyd etmişdir - , lakin bunun mərfusu problemsizdir, çünki aydın göründüyü kimi belə bir şey insanın öz rəyi ilə söylənə bilməz.**” Sonra bunun üçün Əbu Hureyrə’nin əl-Buxari’nin “əs-Sahih” kitabındakı hədisini şahid gətirmişdir.

[32] əl-Buxari bunu “əs-Səhih”də iki yerdə mualləq olaraq qeyd etmişdir. Birinci cəzm siğəsi ilə (1/173), ikinci isə təmrid siğəsi ilə (13/453) qeyd etmişdir. Lakin “əl-Ədəb əl-Mufrad”da (970) və “Xalq Əfalil-İbəd” kitabında (səh: 131) məvsul olaraq, yəni sənədini tam qeyd edərək rəvayət etmişdir. Eynilə İmam Əhməd “əl-Müsnəd”də (3/495), əl-Beyhaqi “əl-Əsma vas-Sıfat”da (səh: 78-79), İbn Əbi Asim “əs-Sünnə”də (səh: 514) və əl-Hakim “əl-Müstədrək”də (2/437, 4/574-575) rəvayət edirlər. əl-Hakim bunu səhih saymış və əz-Zəhəbi bu hökmündə onunla razılaşmışdır. əl-Hafiz İbn Hacər “əl-Fəth”də (1/174) bu rəvayəti gücləndirir, onun üçün birdən çox rəvayət yolunu qeyd etdikdən sonra onlardan biri haqqında “**salehdir**” deyir. Bunun üçün “əl-Fəth” kitabındakı (5/353) qeydlərə bax! əl-Albani “Təxricus-Sünnə”də (514) deyir: “**Hədis səhihdir**.” Bunu İbn Qudamə həm də “əl-Burhan fi Bəyənil-Quran” kitabında da (səh: 86) qeyd edir.

[33] Şeyx İbn Cibrin şərhində (səh: 174) bunun israiliyyatdan olduğunu deyir.

## Quran Allahın həqiqi kəlamıdır

Allahın kəlamından olanlardan biri də Əzəmətli Qurandır. O, Allahın mənası aşkar olan kitabı, möhkəm ipi, dosdoğru yoludur, aləmlərin Rəbbinin ər-Ruhu'l-Əmin vasitəsi ilə peyğəmbərlərin seyyidinin qəlbinə açıq-aşkar ərəb dilində endirdiyi vəhydır. Endirilmişdir, yaradılmamışdır, Ondan gəlmişdir və Ona da qayıdacaqdır.

O, möhkəm surələrdir, açıq-aşkar ayələrdir, hərflər və sözlərdir. "Kim Onu xətasız oxuyarsa, hər bir hərfi üçün on həsənə qazanacaqdır." Onun əvvəli və axırı vardır, cüzləri və hissələri vardır. Dillərdə tilavət edilir, sinələrdə hifz olunur, qulaqlarla eşidilir, mushaflarda yazılıdır. Onda həm möhkəm, həm də mütəşabih ayələr, nəsx edici və nəsx olunmuş ayələr, xüsusi və ümumi ayələr, əmr edən və qadağan edən ayələr mövcuddur: "**Nə önündən, nə də arxasından batil ona girişə bilməz. O, Müdrik, Tərifəlayiq tərəfindən nazil edilmişdir.**" (Fussilət, 42) Allahu Təalə deyir: "**De: "Əgər insanlar və cinlər bu Qurana bənzər bir şey gətirmək üçün toplaşıb, bir-birinə kömək etsələr də ona bənzərini gətirə bilməzlər.**"(əl-İsra, 88) O, ərəbcə olan bu kitabdır ki, Allahu Təalə kafirlərin dili ilə onun haqqında deyir: "**Biz bu Qurana inanmayacağıq...**" (Səba, 31) Onlardan bəziləri dedi: "**Bu, adi insan kəlamından başqa bir şey deyildir.**" (əl-Muddəssir, 25) Allah Subhənəhu (buna cəza olaraq) deyir: "**Mən onu Səqərə salacağam.**" (əl-Muddəssir, 26) Onlardan bəziləri isə şer olduğunu dedilər. Allahu Təalə (buna cavab olaraq) deyir: "**Biz ona şer öyrətmədik, bu ona heç yaraşmaz da. Bu ancaq öyüd-nəsihət və aydın Qurandan başqa bir şey deyildir.**" (Yasin, 69) Allah Onun şer olduğunu inkar edib, Onun Quran olduğunu isbat etdikdə, intellekt sahibi heç kəsdə şübhə qala bilməz ki, Quran, sözlər, hərflər və ayələrdən ibarət, ərəbcə olan məhz bu kitabdır, çünki bu cür olmasaydı heç bir kəs Ona şer adı verməzdi.

Allah - *Azzə və Cəllə* - deyir: "**Əgər qulumuza nazil etdiyimizə şübhə edirsinizsə və doğru deyirsinizsə, onda ona bənzər bir surə gətirin və Allahdan savayı şahidlərinizi çağırın!**" (əl-Bəqərə, 23) Allahın insanlardan nə olduğunu bilinməyən və dərk edilməyən bir şeyi gətirmələrini tələb edərək onları sınağa çağırması mümkün deyildir.

Allahu Təalə deyir: "**Açıq-aydın ayələrimiz onlara oxunduğu zaman Bizimlə qarşılaşacaqlarına ümid etməyənlər deyərlər: "Bizə bundan başqa bir quran gətir**

**və ya Onu dəyişdir!” De: “Mən Onu öz istəyimlə dəyişdirə bilmərəm.**” (Yunus, 15) Bununla sübit etmiş olur ki, Quran, onlara oxunan ayələrdir.

Allahu Təalə deyir: “**Əksinə bu Quran elm verilmiş kəslərin kökslərində olan açıq-aydən ayələrdir.**” (əl-Ənkəbut, 49) Buna and içdikdən sonra Allahu Təalə deyir: “**Həqiqətən bu qiymətli Qurandır. Qorunub saxlanılan Yazıdadır. Ona yalnız pak olanlar toxunur.**” (əl-Vaqiə, 77-79)

Allahu Təalə deyir: “**Kəf. Ha. Yə. Ayn. Sad.**” (Məryəm, 1) “**Ha. Mim. Ayn. Sin. Qaf.**” (əş-Şura, 1-2) İyirmi doqquz surəni bir-birindən ayrı hərflərlə başlamışdır.

Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – deyir: “Kim Quran oxuyar və onu doğru oxuyarsa, oxuduğu hər bir hərf üçün on həsənə vardır. Kim oxuyar və xəta edərsə, onun üçün hər oxuduğu hərfə bir həsənə vardır.”[34] Hədis səhihdir.

O – *aleyhissalətu vassələm* – deyir: “Oxu düz qoyduqları kimi (Quranın) hərflərini də düz qoyacaq, lakin boğazlarından ötə keçməyəcək, əcrini tələsdirəcək, lakin sonraya saxlamayacaq bir qövm gəlmədən əvvəl Quran oxuyun!”[35]

Əbu Bəkr və Ömər – *radiyallahu anhumə* - deyir: “Quranı doğru oxumaq bəzi hərflərini hifz etməkdən bizə daha sevimlidir.”[36] Əli’bnu Əbi Talib – *radiyallahu anhu* – dedi: “Kim Ondan bir hərfə küfr edərsə, tamamına küfr etmişdir.”[37]

---

[34] **Hədis çox zəifdir**. “Məcmə əz-Zəvaid”də (7/163) deyildiyi kimi bunu ət-Tabərani “əl-Əvsat”da İbn Məsud’dan – radiyallahu anhu – rəvayət edir. Dedi: Allahın Elçisi – salləllahu aleyhi va səlləm – dedi: “**Quranı doğru oxuyun, beləki kim Quranı doğru oxuyarsa, ona on həsənə düşür və on günahı silinir və on dərəcə dərəcəsi qalxır.**” əl-Heysəmi deyir: “**Sənədində Nəhşəl adlı ravi var və o, tərk olunmuşdur.**” Nəhşəl isə, adı İbn Said bin Vardan əl-Vardani’dir; tərk olunub və İshaq bin Rahaveyh onun yalançı olduğunu deyib. İbn Qudamə “əl-Burhan”da (38,39) hədisi elə bu şəkildə rəvayət etmiş və səhih olduğunu demişdir. Gördüyünüz kimi hədis zəifdir, İbn Qudamənin gətirdiyi ləfz fərqinin isə heç bir əsli yoxdur.

[35] **Hədis səhihdir**. Əhməd (5/338), Əbu Davud (831), İbn Hibban (1876 – məvarid) rəvayət edir. Sənədində bir qədər zəiflik var, beləki ravilərindən biri Vəfa bin Şureyh əs-Sadəfi’dir, “ət-Təqrib”də deyildiyi kimi məqbuldur; yəni rəvayətində başqaları tərəfindən tabe olunduqda qəbul olunur, əks təqdirdə leyyin hökmündədir. Hədisin şahidləri var və bu şahidlərin sayəsində güclənir. Bu şahidlərdən biri Cabir bin Abdilləh’in Əhmədin “əl-Müsnəd” əsərindəki (3/397) və Əbu Davudun “əs-Sünnə” əsərindəki (830) rəvayətidir və bunun sənədi əl-Albani’nin “əs-Sahihə”də (259) dediyi kimi səhihdir.

[36] **Əsər çox zəifdir**. Bunu İbnul-Ənbəri “əl-Vaqf val-İbtidə” (1/20) kitabında bir qədər fərqli ləfz ilə rəvayət edir: “**Hərflərindən bəzilərini doğru oxumaq sözsüz ki, bəzi hərflərini hifz etməkdən bizə daha xoşdur.**” Sənədi həm zəifdir, həm də qopuqdur. Sənədində Cabir bin Yezid əl-Cafi var və o, zəifdir. Eləcədə Şureyk əl-Qadi sənədində keçməkdədir, saduqdur, çoxlu xətalar edir və hafizəsi dəyişmişdir.

[37] İbn Əbi Şeybə “əl-Musannəf”də (10/513-514), İbn Cərir təfsirində (56) Şueyb bin əl-Həbhab yolu ilə rəvayət edirlər. Dedi: “**Bir kimsə Əbul-Aliyə’nin yanında Quran oxuduqda, heç zaman “onun oxuduğu**

Müsəlmanlar Quranın surələrinin, ayələrinin, sözlərinin və hərflərinin sayında ittifaq ediblər və Quranda üzərində ittifaq edilmiş bir surəni və ya bir ayəni və ya bir sözü və ya bir hərfi inkar edən kəsin kafir olmasında müsəlmanlar arasında heç bir ixtilaf yoxdur. Bunun özündə qəti bir dəlil vardır ki, Quran hərflərdən ibarətdir.

---

**kimi deyildir" deməzdi, lakin sadəcə "mən isə belə oxuyuram" deyərdi. Deyir: "Mən bunu İbrahim ən-Nəxai'yə bildirdim, dedi: "Dostunun bu sözləri eşitdiyini düşünürəm: "Kim Ondan bir hərfə belə küfr edərsə, Onun hamısına küfr etmişdir."** İsnadı səhihdir. Bunu İbn Qudamə "əl-Burhan"da da (səh: 45) rəvayət etmişdir.

## Möminlər Qiyamət günü Rəblərini görəcəklər

Möminlər Axirətdə Rəblərini öz gözləri ilə görəcəklər və Onu ziyarət edəcəklər. Allah onlarla danışacaq və onlar da Onunla danışacaqlar.

Allahu Təalə deyir: "**O gün üzlər nurludur. Öz Rəblərinə baxıcıdırlar.**" (əl-Qiyamə, 22-23) Allahu Təalə deyir: "**Xeyr, həmin gün onlarla Rəbləri arasında pərdə çəkiləcək.**" (əl-Mutaffifin, 15) Qəzəbləndiyi halda onlarla Rəbləri arasında pərdənin olması ona dəlalət edir ki, razı olduğu halda isə möminlər Onu görəcəklər, əks təqdirdə bu iki hal arasında heç bir fərq olmur.

Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – demişdir: "Şübhəsiz ki, heç bir çətinlik çəkmədən ayı gördüyünüz kimi Rəbbinizi də görəcəksiniz."[38] Hədis səhihdir, əl-Buxari və Muslim'in hər ikisi də bunu rəvayət edib.[39] Bu isə bir görmə ilə digər görməni bir-birinə bənzətməkdir, bir görülən şey ilə digər görülən bir şey arasında edilmiş bir bənzətmə deyildir, beləki Allahu Təalənin heç bir bənzəri və heç bir tayı yoxdur.

---

[38] əl-Buxari (573), Muslim (633, 211).

[39] Elm əhlindən bəziləri bu barədə gələn hədislərin mütəvatir olduğunu söyləmişdir. Bunu İbnul-Qayyim "Hadi əl-Ərvah"da (səh: 277), İbn Əbil-İzz əl-Hənəfi "Şərhut-Tahaviyyə"də (1/215) və əl-Hafiz İbn Hacər "Fəthul-Bari"də (1/203) deyir. Bu məsələ haqqında İmam əl-Əcurri'nin "ət-Tasdiq bin-Nəzar iləllahi Təalə fil-Axira" və İbn Şamə əl-Maqdisi'nin "Dəus-Sari ilə Marifəti Ruyətil-Bari" kitablarına müraciət edin!

## Qəza və Qədər

Allahu Təalənin sifətlərindən biri də budur ki, O, dilədiyi şeyi edəndir. Onun istəyi olmadan heç bir şey olmaz. Heç bir şey Onun istəyindən kənara çıxa bilməz. Aləmdə elə bir şey yoxdur ki, Onun təqdirindən (qədərindən) kənara çıxmış olsun. Aləmdəki hər bir şey yalnız və yalnız Onun tədbiri ilə sadir olur. Müəyyən edilmiş qədərdən yayına biləcək heç bir şey yoxdur, Yazılmış Lövhədə yazılanların həddini də aşa bilməzlər. Aləmin etdiklərini O istəyir, əgər onları günahdan qorusaydı Ona qarşı çıxa bilməzdilər. Əgər onların itaət etmələrini diləsəydi sözsüz ki, itaət edərdilər. İnsanları və onların etdiklərini yaratmışdır, onların ruzilərini və ömürlərini müəyyən etmişdir. Dilədiyini rəhməti ilə doğruya yönəldir və dilədiyi kəsi isə hikməti ilə doğru yoldan azdırır. Allahu Təalə deyir: "**Allah gördüyü işlər barəsində sorğu-sual olunmaz; onlar isə sorğu-sual ediləcəklər.**" (əl-Ənbiya, 23) Allahu Təalə deyir: "**Şübhəsiz ki, Biz hər şeyi müəyyən qədərdə yaratdıq.**" (əl-Qəmər, 49) Allahu Təalə deyir: "**O, hər şeyi yaratmış və onun qədərini təqdirlə müəyyən etmişdir.**" (əl-Furqan, 2) Allahu Təalə deyir: "**Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, bir Yazıda olmasın.**" (əl-Hədid, 22) Allahu Təalə yenə deyir: "**Allah kimi doğru yola yönəltmək istəsə, onun köksünü İslam üçün açar, kimi azdırmaq istəsə, onun köksünü, sanki o, göyə çıxırmış kimi daraldar və sıxıntılı edər.**" (əl-Ənam, 125)

İbn Ömər rəvayət edir ki, Cibril – *aleyhissəlam* – peyğəmbərə - *salləllahu aleyhi va səlləm* – demişdir: "İman nədir?" Dedi: "Allaha, mələklərinə, kitablarına, elçilərinə, Axirət gününə və xeyri və şərri ilə qədərə iman etməkdir." Cibril dedi: "Doğru söylədin."[40] Muslim rəvayət etmişdir. Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – demişdir: "Qədərə xeyri və şərri ilə, şirinliyi və acılığı ilə iman gətirdim."[41] Peyğəmbərin – *salləllahu aleyhi*

[40] Muslim (1,8)

[41] **İsnadı zəifdir**. əl-Hakim bunu "Marifətu Ulumil-Hədis"də (31,32) və onun yolu ilə əl-Hafiz əl-İraqi öz "əlfiyyə"sinə yazdığı şərhində (səh: 327) musəlsəl hədis növünə misal olaraq rəvayət etmişlər. Yezid ər-Raqqaşi vasitəsi ilə Ənəs bin Malik'dən rəvayət olunur, Yezid ər-Raqqaşi isə "ət-Təqrib"də (7683) deyildiyi kimi zəifdir, hətta ən-Nəsai onun tərk olunmuş bir ravi olduğunu, Əhməd isə onun hədislərinin münkər olduğunu deyir. Bax: "əl-Mizən" (4/418)

*va səlləm* – vitr namazında qnutda dua etmək üçün əl-Həsənu'bnu Əli'yə öyrətdiyi dualardan da biri bu idi: "Qəza etdiklərinin/hökm etdiklərinin şərrindən məni qoru!"[42]

Əmrlərini tərk etməkdə və qadağalarından uzaq durmaqda Allahın qəzasını və qədərini özümüzə bəhanə saymırıq,[43] əksinə Kitabı endirməklə və peyğəmbərlər göndərməklə hüccətin Allahla olduğunu bilməyimiz və buna iman etməyimiz vacibdir. Allahu Təalə deyir: "**İnsanların elçilərdən sonra Allaha qarşı bir bəhanəsi olmasın.**" (ən-Nisə, 165)

Biz bilirik ki, Allah – *Subhənəhu* – yalnız əməl edilməsi və tərk edilməsi bacarılan şeyləri əmr etmiş və qadağan etmişdir və O, heç kəsi günah etməyə məcbur etməmişdir və nə də itaəti tərk etməyə heç kəsi məcbur etməmişdir. Allahu Təalə deyir: "**Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edər.**" (əl-Bəqərə, 286) Allahu Təalə deyir: "**Allahdan bacardığınız qədər qorxun!**" (ət-Təğabun, 16) Allahu Təalə deyir: "**Bu gün hər kəsə qazandığının əvəzi veriləcəkdir. Bu gün heç bir zülm olmaz.**" (Ğafir, 17) Bu dəlalət edir ki, hər bir qulun əməli və qazancı vardır; yaxşı əməllərinə görə savabla, pis əməllərinə görə isə cəza ilə əvəzi veriləcəkdir. Bunlar Allahın qəzası və qədəri ilə baş verəcəkdir.

---

[42] **Hədis səhihdir**. Əhməd (1723), Əbu Davud (1425, 1426), ət-Tirmizi (464), ən-Nəsai (3/248) və İbn Macə (1178) rəvayət edir. ət-Tirmizi deyir: "**Bu hədis həsəndir**." Şeyx Əhməd Şakir "Sünənut-Tirmizi"yə yazdığı qeydlərində hədisi səhih saymışdır.

[43] Yəni biz "əgər Allah artıq qədərimi yazıbsa, artıq cənnətlik və ya cəhənnəmlik olduğumuzu təqdir edibsə, o zaman əməl etməyin faydası yoxdur" deyərək özümüzə bəhanə gətirmirik. Çünki cənnətlik, yoxsa cəhənnəmlik olduğumuzu bilmirik, buna görə də cənnətlik olmağımız üçün çalışmalıyıq. Çünki Allahu Təalə hər şeyi əvvəldən bilir və bizim qarşıda belə bir bəhanəyə aldanaraq əməllərdən kəsilib kəsilməyəcəyimizi də bilir. Ona görə belə bir bəhanə əsassızdır.

## İman söz və əməldir

İman, dil ilə söyləmək, əzalarla əməl etmək, qəlb ilə etiqad etməkdir; itaət ilə artar və üsyan ilə azalar.

Allahu Təalə deyir: “**Halbuki onlara, dini məhz Allaha məxsus edərək ixlasla həniflər kimi ibadət etmək, namaz qılmaq və zəkat vermək əmr olunmuşdu. Doğru din də elə budur!**” (əl-Beyyinə, 5) Allahu Təaləyə ibadəti, qəlbin ixlasını, namazı qılmağı və zəkat verməyin hamısını dindən saymışdır. Allahın Elçisi – salləllahu aleyhi va səlləm – demişdir: “İman yetmişdən bir az çox şöbədən ibarətdir: ən yuxarı şöbəsi Allahdan başqa ibadətə layiq məbudun olmamasına şəhadət etməkdir, ən aşağı şöbə isə yoldan əziyyət verən şeyləri qaldırmaqdır.”[44] Bununla da söz ilə əməlin hər ikisini də imandan saymışdır. Allahu Təalə deyir: “Onların imanını daha da artırdı.” (Ali-İmran, 173) Yenə buyurur: “İmanı üstünə iman artırmaq üçün...” (əl-Fəth, 4) Allahın Elçisi – salləllahu aleyhi va səlləm – demişdir: “Lə iləhə illə Allah” demiş və qəlbində arpa dənəsi və ya xardal və ya zərrə ağırlığında imanı olan hər bir kəs atəşdən çıxacaq.”[45] Beləliklə imanı bir-birindən üstün dərəcədə zikr etmişdir.

---

[44] əl-Buxari (9), Muslim (35)

[45] əl-Buxari (44), Muslim (193)

## Peyğəmbərin xəbər verdiyi hər bir şeyə iman etmək

Peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – xəbər verdiyi və ondan səhih olaraq nəql edilən hər bir şeyə, həm müşahidə edə bildiklərimizə, həm də qeybdən olan hər bir şeyə iman etmək vacibdir. Bilirik ki, o haqdır və doğrudur. Bütün bunlarda dərk edə bildiklərimiz ilə həqiqətinin mənasından xəbərsiz olduğumuz, cahil olduğumuz şeylər arasında fərq yoxdur. İsra və merac hədisi buna misaldır; bu, yuxuda olarkən deyil ayıq olduğu halda baş vermişdir, beləki qureyşlilər bunu inkar etmiş, bunu imkansız bir şey saymışdılar, halbuki yuxuda görülən şeylər isə inkar edilmir.

Bunlardan biri də budur ki, ölüm mələyi ruhunu almaq üçün Musanın – *aleyhissələm* – yanına gəldikdə onu vurmuş və gözünü çıxarmışdır. Rəbbinə geri dönmüş və ona gözünü geri vermişdir.[46]

---

[46] Bu hədisi əl-Buxari (3407) və Muslim (2372, 157) rəvayət edib.

Şeyx Əhməd Şakir "əl-Müsnəd"də 7634 rəqəmli hədisə yazdığı qeydlərində bu barədə İbn Hibban'ın sözlərini nəql edir. İbn Hibban deyir: "**Şübhəsiz ki, Allah – Cəllə va Alə - Elçisini xəlq etdiklərinə müəllim olaraq göndərmiş, muradını izah edici olaraq endirmişdir. Peyğəmbər də risaləsini təbliğ etmiş və Onun ayələrini mücməl və müfəssəl sözlərlə izah etmişdir. Səhabələri və ya səhabələrdən bəziləri onun bu sözlərini əql ediblər. Bu xəbər də haqqı tapmaqda tövfiqdən məhrum olmamış kəslərin mənasını dərk edə bildikləri xəbərlərdəndir. Mənası budur ki, Allah – Cəllə va Alə - ölüm mələyini Musanın – aleyhissələm - yanına sınaq etmək üçün göndərmiş və ona "Rəbbinın çağırışına cavab ver!" deməsini əmr etmişdi. Bir sınaq əmri ilə göndərmişdi, əmrin həqiqətən yerinə yetirilməsi üçün göndərməmişdi, necəki xəlili İbrahimə - aleyhissələm – oğlunu qurban kəsməsini bir sınaq olaraq əmr etmişdi, yoxsa yerinə yetirilməsini istədiyi bir iş olaraq əmr etməmişdi. Oğlunu kəsməyə qərar verdikdə, onu üz üstə yerə sərdikdə, əzəmətli qurbanla əvəz etdi. Allah – Cəllə va Alə - elçilərinə tanımadıqları surətlərə girmiş mələklər göndərmişdir, necəki mələklər İbrahimin – aleyhissələm – yanına daxil olmuşdular, onları tanımamışdı, hətta çəkinərək onlardan qorxmuşdu. Eləcədə Cibrilin – aleyhissələm – peyğəmbərin – salləllahu aleyhi va səlləm – yanına gələrək onu iman və islam haqqında sorğu sual etməsi də bunun kimidir, o, yaxınlaşmadan əvvəl əl-Mustafa (yəni peyğəmbər) onu tanımamışdı. Eynilə ölüm mələyi də Musanın – aleyhissələm – onu tanıdığı surətdən fərqli bir surətdə Musanın – aleyhissələm – yanına gəlmişdi. Musa çox qısqanc biri idi və evində tanımadığı bir kişini görür, əlini qaldıraraq bir zərbə endirir və zərbəsi, Allahın onu əslən yaratdığı forma deyil sonradan girdiyi surətə uyğun bir formada olan gözünü çıxardı. Ibn Abbasdan gələn xəbərdə peyğəmbərimiz "Cibril iki dəfə Kəbədə mənə imamlıq etdi..." deyir və xəbəri zikr etdikdən sonra sonunda açıq şəkildə "(Cibril dedi) Bu sənin və səndən əvvəlki peyğəmbərlərin vaxtıdır" deməsilə, xəbərdən açıq şəkildə görünür ki, bizim şəriətimiz əvvəlki ümmətlərin şəriətləri ilə üst-üstə düşür. Kitabımızın bir çox yerində qeyd etdiyimiz çoxsaylı xəbərlərə əsasən bizim**

Qiyamət gününün əlamətləri də bura aiddir; dəccalın çıxışı, İsa ibnu Məryəm'in – *aleyhissələm* - nüzulu və sonra onu öldürməsi, Yəcud və Məcuc'un peyda olması, heyvanın (yerdən) çıxması, günəşin qərbdən çıxışı və buna bənzər səhih olaraq rəvayət edilmiş xəbərlər.

Qəbir əzabı və qəbirdəki nemətlər haqdır, peyğəmbər – *salləllahu aleyhi va səlləm* – ondan Allaha sığınmışdır və hər namazda o dua ilə dua etməyi əmr etmişdir. Qəbir fitnəsi də haqdır. Munkər və Nəkir'in sualları da haqdır.[47]

Ölümdən sonra yenidən dirilmək də haqdır və bu, İsrafil'in – *aleyhissələm* – sura üfürməsi ilə baş verəcəkdir: "**Sur ikinci dəfə üfürülən kimi onlar dərhal qəbirlərdən çıxıb Rəblərinə tərəf axışacaqlar.**" (Yasin, 51) İnsanlar Qiyamət günü ayaqyalın, lüt, sünnətsiz və qaralmış halda həşr olunacaqlar. Peyğəmbərimiz Muhammədə – *salləllahu aleyhi va səlləm* – onlar üçün şəfaət edənə qədər qiyamət yerində duracaqlar.

Allah – *Təbarakə və Təalə* - onları hesaba çəkəcək və tərəzilər qurulacaq. "Divanlar"[48] açılacaq, əməllərin içində yazıldığı səhifələr sağ və sol əllərə dağıdılacaq: "**Kimin kitabı sağ əlinə veriləcəksə, o, yüngül sorğu-suala tutulacaq və sevincək öz ailəsinə qayıdacaqdır. Kimin kitabı arxa tərəfindən veriləcəksə, o, özünə ölüm diləyəcək və alovlu oda atılacaqdır.**" (əl-İnşiqaq, 7-12)

Tərəzinin iki gözü və bir dili vardır ki, onunla əməllər ölçüləcəkdir: "**O gün məhz tərəziləri ağır gələnlər nicat tapacaqlar. Tərəziləri yüngül gələnlər isə özlərini**

---

**şəriətə görə evinə iznsiz girənin və ya evinin içinə izn olmadan baxanın gözünü çıxardanın üzərində heç bir günah olmadığı üçün , bunu edənin üzərində heç bir sıxıntı olmadığı üçün, bizim şəriətlə Musanın şəriətinin evinə iznsiz girənin gözünü çıxardanın üzərindən günahın düşürülməsi məsələsində üst-üstə düşməsi mümkün olur. O zaman Musanın bunu etməsi mübah olur və üzərinə heç bir günah düşməz.**"

[47] Şeyx İbn Useymin bu sözlərin şərhində (səh: 112) deyir: "**Səhih görüşə görə həm bu ümmətin, həm də başqa ümmətin möminli kafirli hamısı (qəbirdə) sorğu sual olunacaqlar, lakin qeyri-mükəlləfin (yəni, uşaq və dəlinin) sorğu-sual olmasında ixtilaf vardır. İbnul-Qayyim'in "ər-Ruh" kitabındakı sözünün zahirinə görə onların da sorğu-sual olması üstün görüşdür. ən-Nəsai'in rəvayət etdiyi hədisə əsasən şəhid olan və Muslim'in rəvayət etdiyi hədisə əsasən isə Allah uğrunda ribatda ölən kəslər isə bundan istisna olunmuşdur.**"

[48] "Divan" sözün tək formasıdır, "dəvavin" isə cəm şəklidir. Şeyx İbn Useymin deyir: "**Dəvavin, divan sözünün cəm şəklidir. Lüğətdə qoşunun və bənzəri şeylərin sayının qeyd olunduğu kitab anlamına gəlir. Şəriətdə isə bu, əməl sahibləri üzərinə mələklərin əməllərini yazdıqları kitabdır.**" (Şərh Lumətil-İtiqad", səh: 123)

**ziyana uğradanlardır. Onlar Cəhənnəmdə əbədi qalacaqlar.**” (əl-Muminun, 102-103)

Peyğəmbərimiz Muhamməddin – *salləllahu aleyhi va səlləm* – qiyamət günü bir hovuzu vardır ki, suyu süddən ağ, baldan şirindir və qabları isə səmadakı ulduzların sayı qədərdir. Kim ondan bir dəfə içərsə ondan sonra heç bir zaman susamaz.

Sirat körpüsü də haqdır, xeyirxahlar onu keçərlər, facirlər isə oradan yıxılacaqlar.

Peyğəmbərimiz – *salləllahu aleyhi va səlləm* – ümmətindən böyük günah sahiblərindən atəşə daxil olmuş kəslər üçün şəfaət edəcək və yandıqdan, kömür və köz kimi olduqdan sonra onun şəfaəti ilə çıxacaqlar və onun şəfaəti ilə cənnətə daxil olacaqlar. Digər peyğəmbərlər, möminlər və mələklərin də şəfaəətləri vardır. Allahu Təalə deyir: “**Allah onların keçmişini və gələcəyini bilir. Onlar yalnız Onun razı qaldığı şəxslərdən ötrü şəfaət diləyir və Onun qorxusundan tir-tir əsirlər.**” (ən-Ənbiya, 28) Kafirə isə şəfaətçilərin şəfaəti heç bir fayda verməz.

Cənnət də, atəş də heç bir zaman tükənməyən iki məxluqdur; cənnət Allah dostlarının mənzili, atəş isə Onun düşmənlərinin əzabıdır. Cənnət əhli orada əbədi yaşayacaqlar: “**Cinayətkarlar isə, şübhəsiz ki, əbədi olaraq cəhənnəm əzabı içində qalacaqlar. Onlardan yüngülləşdirilməyəcəkdir; onlar orada əllərini hər şeydən üzmüş olacaqlar.**” (əz-Zuxruf, 74.75) Ölüm isə gözəl bir qoç şəklində gətiriləcək, cənnət və atəş arasında kəsiləcəkdir. Sonra deyiləcək: “Ey cənnət əhli! Əbədi həyat var, ölüm yoxdur! Ey atəş əhli! Əbədi qalma var, ölüm yoxdur!”[49]

[49] əl-Buxari (4730)

## Muhamməd peyğəmbərlərin sonuncudur

Allahın Elçisi Muhamməd – *salləllahu aleyhi va səlləm* – peyğəmbərlərin sonuncu, göndərilmişlərin seyyididir. Onun risaləsinə iman etməmiş, onun peyğəmbərliyinə şahidlik gətirməmiş heç bir qulun imanı səhih olmaz. Onun şəfaəti olmadan insanlar arasında Qiyamət günü hökm verilməyəcək. Onun ümməti girmədən öncə heç bir ümmət cənnətə daxil olmayacaq.

Həmd bayrağının, ən çox tərifə layiq məqamın və qurulmuş hovuzun sahibi odur. O, peyğəmbərlərin imamı, xatibi və onların şəfaətlərinin sahibidir.

Onun ümmətin ümmətlərin ən xeyirlisi və səhabələri peyğəmbərlərin – *aleyhimussələm* - səhabələri içində ən xeyirliləridir.

Ümmətinin ən fəzilətlisi Əbu Bəkr əs-Siddiq, sonra Ömər əl-Faruq, sonra Osman Zun-Nureyn və sonra Əli əl-Murtəda sayılır; Allah onların hamısından razı olsun! Bunun dəlili isə Abdullahi'bnu Ömər'in – *radiyallahu anhumə* - rəvayət etdiyi sözlərdir. Dedi: "Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – sağ olduğu zaman belə deyərdik: "Peyğəmbərindən sonra bu ümmətin ən fəzilətlisi Əbu Bəkr, sonra Ömər, sonra Osman[50], sonra Əlidir. Bu sözlərimiz peyğəmbərə - *salləllahu aleyhi va səlləm* – çatardı, lakin inkar etməzdi." Əlidən – *radiyallahu anhu* – onun belə dediyi səhih olaraq rəvayət edilmişdir: "Peyğəmbərindən sonra bu ümmətin ən xeyirlisi Əbu Bəkr, sonra Ömərdir. Diləsəniz üçüncüsünü də qeyd edərəm."[51]

---

[50] "Lumətul-İtiqad" kitabının "əs-Sələfiyyə" təbəəsində kitaba qeydlər əlavə etmiş muhaqqiq səh: 25-də deyir: "**Dəməşq" təbəəsinin 1338 tarixli nəşrində və "əl-Mənar" təbəəsinin 1340 tarixli nəşrində yalnız üç səhabənin adı qeyd edilmişdi. 1351 və 1355-ci illərin nəşrində isə "sonra Əli" sözləri əlavə olunmuşdur.**" Şeyx İbn Useymin deyir: "Bunların ən fəzilətliləri dörd nəfərdir: Əbu Bəkr, sonra Ömər, sonra Osman, sonra Əlidir. İbn Ömərin – radiyallahu anhumə - rəvayət etdiyi hədisə görə: "

[51] Rəvayət səhihdir. İmam Əhməd "əl-Müsnəd"də (1/106, 110), onun oğlu Abdullah isə "Zəvaidul-Musnəd"də (1/106, 110, 127), yenə Əhməd "Fədailus-Sahabə"də (397) səhih və həsən sənədlərlə rəvayət edirlər. Bunu eynilə İbn Əbi Asim "əs-Sünnə"də (1201) rəvayət edir və Şeyx əl-Albani "əs-Sünnə" kitabının təxricində (2/570) səhih saymışdır.

Əbud-Darda isə peyğəmbərdən – *salləllahu aleyhi va səlləm* – belə dediyini rəvayət etmişdir: "Günəş peyğəmbərlərdən və elçilərdən sonra Əbu Bəkrdən daha fəzilətli biri üzərində çıxmamış və batmamışdır."

Allahın yaratdıqları arasında peyğəmbərdən – *salləllahu aleyhi va səlləm* – sonra xəlifəliyə ən çox layiq olan odur, çünki o, fəzilət sahibdir, ilk müsəlman olanlardandır, peyğəmbər – *salləllahu aleyhi va səlləm* – namazda imam durmaq üçün bütün səhabələr içindən – *radiyallahu anhum* – onu seçmişdir və onun daha layiq olmasında və ona beyət etmədə səhabələr icma etmişlər, halbuki Allah heç bir zaman onları zəlalət üzərində birləşdirməz.

Ondan sonra isə (xəlifəliyə daha çox layiq olan) Ömərdir, *radiyallahu anhu*, çünki fəzilət sahibidir və Əbu Bəkr (xəlifəliyi) ona etibar etmişdir.

Daha sonra isə Osmandır, *radiyallahu anhu*, çünki şura əhli onu daha layiq görmüşdür.

Daha sonra isə Əlidir, *radiyallahu anhu*, çünki fəzilət sahibidir və əsrinin insanları onun üzərində icma etmişdir.

Bunlar hidayət üzərində olan o adil xəlifələrdir ki, Allahın Elçisi – *salləllahu aleyhi va səlləm* – onlar haqqında demişdir: "Məndən sonra sünnətimə və hidayət üzərində olan adil xəlifələrin sünnətinə tabe olun! Azı dişlərinizlə ondan tutunun!" Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – yenə demişdir: "Məndən sonra xilafət otuz il olacaq." Xilafətin axırı Əlinin – *radiyallahu anhu* – xilafəti idi.

On nəfər səhabəyə cənnətlik olmaqları ilə şahidlik edirik, necəki peyğəmbər – *salləllahu aleyhi va səlləm* – onlar üçün şahidlik etmişdir: "Əbu Bəkr cənnətdədir, Ömər cənnətdədir, Osman cənnətdədir, Əli cənnətdədir, Talha cənnətdədir, Zubeyr cənnətdədir, Sad cənnətdədir, Səid cənnətdədir, Abdurrahməni'bnu Auf cənnətdədir, Əbu Ubeydəti'bnu'l-Cərrah cənnətdədir." Peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – cənnətlik olması ilə şahidlik etdiyi hər bir kəs üçün biz də şahidlik edirik, məsələn bu sözündə dediyi kimi: "əl-Həsən və əl-Hüseyn cənnət əhlinin gənclərinin iki seyyididir." Sabitu'bnu Qeys üçün isə demişdir ki, "o, cənnət əhlindəndir."

## Fəsl

Qiblə əhlindən heç kəs haqqında nə cənnətlik, nə də cəhənnəmlik olması haqqında qəti bir hökm vermirik, lakin peyğəmbərin – *salləllahu aleyhi va sələm* – haqlarında belə bir hökm verdiyi kəslər istisnadır. Amma yaxşı əməl edən üçün ümid edir, pis əməl edənlər üçün isə qorxuruq.

Qiblə əhlindən heç bir kəsi günahına görə təkfir etmirik, nə də bir əməlinə görə onu İslamdan çıxarmırıq.

Adil və ya facir olmasından asılı olmayaraq hər bir imama itaət altında həcc və cihadın əbədiyyən davam edəcəyinə inanırıq. Onların arxasında cümə namazı qılmaq caizdir. Ənəs dedi: “Peyğəmbər – *salləllahu aleyhi va sələm* – dedi: “Üç şey imanın əslindəndir: “*Lə iləhə illə Allah*” deyən kəsi rahat buraxmaq; onu günahına görə təkfir etmirik, əməlinə görə İslamdan çıxarmırıq. Cihad isə Allah – *Azzə və Cəllə* - məni göndərəndən ümmətimin sonuncularının dəccalla vuruşmalarına qədər davam edəcəkdir. Nə zalımların zülmü, nə də adillərin adilliyi onu batil etməz. Bir də qədərə iman etmək.” Bunu Əbu Davud rəvayət etmişdir.

Peyğəmbərin – *salləllahu aleyhi va sələm* - səhabələrini dost edinmək, onları sevmək, gözəl əməllərini yad etmək, onlar üçün rəhmət oxumaq, bağışlanma diləmək, onların etdikləri xoşa gəlməz əməlləri və öz aralarında baş verən hadisələri yad etməkdən əl çəkmək, onların fəzilət sahibi olmaqlarına etiqad etmək və hamıdan başda olduqlarını bilmək sünnətdəndir. Allahu Təalə deyir: “**Onlardan sonra gələnlər belə deyirlər: “Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş qardaşlarımızı bağışla! Qəlblərimizdə iman gətirənlərə qarşı kinə yer vermə!**” (əl-Həşr, 10) Allahu Təalə yenə deyir: “**Muhamməd Allahın peyğəmbəridir. Onunla birlikdə olanlar kafirlərə qarşı sərt, bir-birilərinə qarşı isə mərhəmətlidir.**” (əl-Fəth, 29) Peyğəmbər isə - *salləllahu aleyhi va sələm* – demişdir: “Səhabələrimi söyməyin, çünki sizdən biriniz Uhud dağı boyda sədəqə versə belə onlardan birinə, nə də yarısına çata bilməz.”

Peyğəmbərin – *salləllahu aleyhi va sələm* – zövcələri, pak və bütün pis şeylərdən uzaq olan möminlərin analarından razı olmaq da sünnətdəndir. Onların ən fəzilətlisi Xədicə

bintu Xuveylid və Allahın Kitabında təmizə çıxardığı, peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – həm dünyada, həm də Axirətdə həyat yoldaşı olan Aişətu's-Siddiqa bintu's-Siddiq'dir. Allahın onu təmizə çıxardığı şeylərdə kim ona şərr atarsa, əzəmətli Allaha küfr etmişdir.

Müaviyə isə möminlərin dayısıdır, vəhy katibidir və müsəlmanların xəlifələrindən – radiyallahu anhum – biridir.

Yaxşısı ilə faciri arasında fərq qoymadan müsəlmanların imamlarına  və möminlərin əmirlərinə, günah etməyi əmr etmədikləri müddətdə itaət etmək və sözlərini dinləmək sünnətdəndir, çünki Allaha asilik olan bir şeydə heç kəsə itaət etmək olmaz. İnsanların üzərində birləşdiyi və ondan razı olduqları halda kimsə xəlifəlik vəzifəsinə gətirilərsə, ya da xəlifə olmaq üçün qılınc gücü ilə onlara üstün gələrsə və möminlərin əmiri adlanarsa, ona itaət etmək vacibdir, ona müxalif olmaq, qarşı çıxmaq və müsəlmanlar arasında təfriqə yaratmaq isə haramdır.

Bidət əhlindən ayrılmaq və onlardan uzaqlaşmaq, dində mübahisə və rəqabəti tərk etmək, bidət əhlinin kitablarına baxmağı, sözlərinə qulaq asmağı tərk etmək sünnətdəndir. Dində sonradan uydurulmuş hər bir şey bidətdir.

İslamdan və sünnətdən başqa bir şeylə özünü səciyyələndirən hər kəs bidətçidir. Bura rafizilər, cəhmiyyə, xavaric, qədərilər, murciələr, mötəzilə, kəramiyyə, kulləbiyyə və onların bənzərləri aiddir. Onların hamısı zəlalət firqələri, bidət tayfalarıdır. Allah bizləri onlardan qorusun!

Lakin dörd məzhəb kimi dinin furu məsələlərində bir imama gəldikdə isə belə bir şey qınanmamışdır, çünki furu məsələlərində baş vermiş ixtilaf bir rəhmətdir və bu məsələlərdə ixtilaf edənlər öz ixtilaflarına görə tərifəlayiqdirlər, ictihadlarına görə mükafat sahibidirlər. Onların ittifaqları geniş bir rəhmətdir, ittifaqları isə qəti bir hüccətdir.

Allahdan bizləri bidətdən və fitnədən qorumasını, bizləri İslam və sünnət üzərində diriltməsini, bizləri bu həyatda peyğəmbərinə - salləllahu aleyhi va səlləm – tabe olanlardan etməsini və ölümdən sonra bizi onun zümrəsində rəhməti və lütfü ilə həşr etməsini diləyirik!

Amin!

Etiqadın son hissəsi budur.

*Val-həmdulilləhi vahdəhu va salləllahu alə seyyidinə Muhamımədin va Alihi va sahbihi va səlləmə təslimə!*